Şənbə, 26 şəban 1336 | **On altımcı il** | 17 sövr 1300

# ملا نصرالدین

# MOLLA-NƏSRƏDDİN

Şümarə 7 | *Qiyməti satıcı əlində on altı şahı* | № 7

**Seyid Əli Bəhzadi**




***Bu qoyun gənəsi haradan mənim qıçıma yapışıb.***



Təbriz geravürsaziye Hüseyni

***Abunə qiyməti:*** ***Hər həftə nəşr olunur*** ***Məhəlli-idarə:***

Üç aylığı 12 qran

Tək nüsxəsi satıcı əlində 16 şahı

*Təbriz, bazari usta şagird, xanəyi şahzadə Nüsrətüssəltənə*

*Teleqraf və post ünvanı: Təbriz, "Molla Nəsrəddin"*

## MÜŞTƏRİLƏRİMİZƏ

Çün 11 sövr tarixdə Bakıdan idarəmizə gələn teleqraf ilə ruznaməmizin müdiri Cəlil Məmmədquluzadəni Qafqaz Azərbaycan Cümhuriyyəti maarifinə müdir dəvət eləyirlər və bu surətdə ehtimal olunur ki, "Molla Nəsrəddin"in Təbriz nəşrində tətil üz verə, bu babətdən möhtərəm oxucularımızdan xahişimiz budur ki, icalətən idarəmizə üç aylıq müddətindən artiq abunə pulu göndərməsinlər.

*İdarədən*

## MƏKTUBE-AĞAYE-RƏİSE-MAARİF

Ağaye modere mohtərəme cərideye şərifeye "Molla Nəsrəddin" damə tofiğə! Şərhi ke dər nomreye 6 cərideye şərife race be təbliğate missionerhaye Amerika dərc şode bud qəraət gərdid. Edareye Məarif ba in əfkare modire mohtərəm kəmale movafeqət ra darəd və bəyanate sadeqane və xeyrxahaneye mondərece ra təğdir minəmayəd. Yəli comleye əxire an: (edareyi Maarifimiz görəsən bu məqaləmizdən incimədi ki?) ta yek əndaze baese təəssof gərdid. Zira edareye Maarif sabeqən mosəmməm gərdide ke mədarese əcnəbi ra həm be təhte təftiş dəravərəd və kərrarən mərateb ra beməqamate aliyye ezhar və nəzəriyyate xod ra pişnəhad nəmude. Vəli ta hal be edare təlimati dade nəşode ta bemouğeye ecra qozaşte və mədarese xareci ra həm fəqət be tədris və təlim vadar nəmayəd.

*Rəise əyalətiye maarif*

# ƏDƏBİYYAT

Gəliri cürbəcür qəribə səsi
Gahi yas andırıb, gəhi həvəsi,
Hanı İranda bircə dadrəsi
Ta deyim dərdimi ona biləsi
"Hər dəm əz omr mirəvəd nəfəsi
Çon negəh mikonəm nəmanəd bəsi".

Ey olan bişərəfliyə tabi,
Sikkədən ötri can verən yabi,
Gəl dəxi huşa, bəsdi, qullabi,
Ey ke, pəncah rəfte dər xabi
İn zaman yab digər əsbabi.
Getdi sərpuş boşdu boşqabı.

Gərçi fərmayiş etdi Kəblə Xəlil
Sikkənin ləzzətinə yoxdu ədil,
Çəkmə sən əl nə qədər olsa qəlil
Tez oyan, gözlərin dadaş, bir sil.
Xabe nuşine bamdade rəhil
Adəmi ra konəd xers, ço fil.

Əzilib millət, ey filan biar,
Qırılıbdır dəxi bu bəndi-üzar
Soyulub rəxti, qalmayıb şəlvar
Ey tohidəst, rəfte dər bazar
Bəhre ordu do qors nan biyar.

Gərçi dər in diyar həqq ədəm əst,
Həqqu dadxah xeyli kəm əst,
Qədri ahəstə ro ke kuçe nəm əst,
Əhle ədliyye çon bema həkəm əst,
Mayeye eyşe adəmi şekəm əst,
Gər be teryak mirəvəd çe ğəm əst?

Çar məslək deyibdülə örgəş,
Qəflət etmə, oyan, dəxi tərpəş,
Bir riyasətdən ötrü çox əlləş,
Molla Sə'di deyib əcəb biğəş:
Çar təbe-müxalefe sərkeş
Çənd ruzi şəvənd bahəm xoş
Hər yeki zin çahar şod ğaleb
Duzəxə eyləyər səni talib.

*İmza: Tanburançı*

## AX, NİKALAY!

Mən buna çox təəccüb eləyirəm ki, iranlıların bəzisi Nikalayı pisləyirlər ki, guya Nikalay müstəbid bir padşah imiş. Bu giley-güzarı azad millətlər eləməyə haqları var: əlbəttə, Nikalay azadlığın düşməni idi. Ama bir bunu lazımdır deməki, aya hər sözü insafnan danışmaq lazımdı, ya başı çuvaldan. Əgər insafnan duraq danışmağa, vallah-billah, biz iranlıların Nikalayı pisləməyə heç haqqımız yoxdur, çünki adam adama deyər: "Öz annında tiri görmürsən, xalqın annında qılı görürsən!".

Ax, Nikalay! And olsun Allaha, mən Nikalayı qəlbimin dərin yerindən arzu edirəm. İndi soruşan gərək niyə və nə səbəbə arzu edirəm? İzn versən, bu saat səbəbini bir-bir qoyaram qabağına. Burada üç səbəb var:

1) Qulluği-şərafətməabıva ərz olsun ki, Nikalayın səltənət dövrəsinin lap istibdad vaxtlarında genə Rusiya millətinin o qədər hörməti və ixtiyarı var idi ki, Allah o hörmət və ixtiyarın heç olmazsa yarısını biz iranlılara yanılıb qismət eləsə, papağımızı min dəfə göyə atarıq.

Canım sənə desin, Nikalay əsrində hələ Rusiyaya məşrutə verilməmiş zamanda, rusların cəmi mülki idarələri millət vəkillərinin əlində idi ki, rusca həmin vəzi-idarənin adı Zemstvodur; məsələn, kəndlərin maarif işləri, şəfaiyyə işləri, maliyyat işləri, yol işləri, (necə ki biz qazı-qazı deyirik Fəvayidi-amə – bəd nəzər, yum gözlərini) bəli, bu işlər millət vəkilləri tərəfindən idarə olunurdu. Bu bir (amma barmağını yum, yadından çıxmasm).

İkimcisi budur ki, şəhərlərdə Nikalayın istibdad zamanında cəmi bələdiyyə idarələri millət vəkillərinin ixtiyarında idi. Bu iki (yum barmağını).

Qaldı üçümcüsü, bunu ərz eləyim, söhbəti qurtarım (yoxsa uzun olsa, yazıqsan, yuxun qaçar).

Üçümcü də budur ki, Nikalayın əsrində, hələ məşrutədən də qabaq ədliyyə hakimlərinin cələsələrində üç nəfər nizami hakimlərin müqabilində millətin müxtəlif təbəqələrindən intixab olunmuş on iki nəfər millət vəkilləri nə yolda rə'y versə idilər və rəsmi hakimlər həmin vəkillərin rəylərinə müvafiq işə əncam və fitva verməyə məcbur idilər.

Amma qorxuram başa düşməyəsən, çün görürəm əsnəyirsən.

Ax, Nikalay! Gör bəxtin necə yatıb ki, səni iranlılar da müstəbid hesab eləyirlər.

Amma öz aramızdır, Nikalayın bir böyük eybi var idi: eybi də bu idi ki, Rasputin adında bir lotunu oturtmuşdu öz yanında, səhər qayqanaq, axşam sədri düyüsündən plov və qəlyan (hələ bəlkə tiryak da). Cüvəllağı Rasputin korazehin padşahı elə təsxir eləmişdi ki, bir ovqat Rusiya məmləkətinin padşahını Rasputin bilirdilər (amma Rusiyanın da evini Rasputin yıxdı).

Bu barədə istəyirdim bir söz danışam, amma vallah, qorxuram. Billah, qorxuram, qardaş. Zora salma, qorxuram.

*Molla Nəsrəddin*

## ALƏMİ-ZƏRİDƏ ALINAN RƏ'YLƏR

Xudayi-mütəal xilqət aləmindən əqdəm ərvahi-məxluqatı bə'zi təkalifdən ötrü hazır olmağa əmr etdilər. O vaxt be həsbi-hökmi-Pərvərdigar hamı hazır olub müntəziri-fərmani-həzrət mail oldular.

O halda məsdəri-ilahidən xitab yetişdi ki: ey mənim bəndələrim, kimdir sizlərdən aləmi-xilqətə qədəm qoyandan sora ali qəsrlərdə əgləşib plov yeyən? Hamı dövlətlilər barmaqların götürdülər ki: biz. Allah tərəfindən plov yeməği dövlətli ə'yanlara məxsus etdilər.

Dübarə nida yetişdi: ey mənim bəndələrim, kimdir sizdən ət və aş yeyən? Kəsəbələr və əsnaflar dedilər ki: biz! Ət və aş da onlara məxsus oldu.

Genə xitab yetişdi məxluqata: kimdir sizdən qatıq ilə ömrünü keçirdən? Fəhlələr barmaqlarını götürüb dedilər ki: biz. O da onlara yetişdi.

Dördümcü dəfə genə xitab yetişdi ki: kimdir sizlərdən ömründə ət dadmayan və yavan çörək ixtiyar edən. O vaxt camaat arasından bir iddeyi-qəlili zəif sədalar ilə dedilər ki: biz! O tərəfdən məxluqat içində qeylü qal düşüb ki, görəsən bu fəhlədən əskik camaat kimlərdirlər.

Gördülər bir camaatı zahirən məsrur, batinən məhzun. Əllərində bir parça gil, qabaqlarında bir siyah taxta, milyon-milyon həzar şəkillərin rəsm edib həsrət ilə baxırlar. Soruşdular: siz kimsiniz ki, zilləti ixtiyar edirsiz? Dedilər: biz bu camaatın İranda ibtidai müəllimləriyuğ. Xudavənd tərəfindən yavan çörək də olara məxsus oldu və qərar qoyuldu ki, bu təam müəllimlərə məxsusdur, ondan ötrü əhli-elmdirlər. Hərgah yaxşı təam tənavül edələr tənbəl və kəsil olub dərs hazır edə bilməzlər. Əlhəqq odur ki, İranın ibtidai müəllimləri, ələlxusus Azərbaycan muəllımləri təmam kürrənin ibtidai müəllimlərindən zehnli və elmlidirlər.

*İmza: Həftəxəyal*

## TÜSTÜ

Yer üzündə ikicə şəhərdə hamamların tulanbarında peyin yandırırlar: bir Naxçıvanda, bir də Təbrizdə.

Yer üzündə cəmi hamamlar ya neft ilə qızır, ya odun ilə. Hətta dılğır Marağada, Xoyda və qeyri şəhərlərdə də hamam odun ilə qızır. Və yer üzündə bir şəhər yoxdur ki, onun tüstüsü qonşuya əziyyət eləsin.

Yer üzündə bir millət qalmayıb ki, peyini çəki ilə satın alıb əkin yerlərinə tökməsin. Bircə Təbrizdə peyin müftədir, çünki Təbriz vilayətində əkin olmasa, Allah-taala yox yerdən bizə çörək verər. Və çün peyin müftədir, o səbəbdən də hamamçılar oduna pul vermirlər, çünki pul versələr, hamam sahibləri o qədər dövlət qazana bilməzlər ki, indi qazanırlar.

Millətə təfavüt eləmir, əgər mənim əcəlim tamam deyil, hamam tüstüsü ki, məni indidən öldürməz. Onunçun tək bircə nəfərin də fikrinə gəlmir ki, dünyada yaşamaq ibarət deyil ondan ki, səhər dükana gedib, axşam abgüştü yeyib yatasan. Sən ki, hamamın qoxumuş peyininin, üfunətli tüstüsünün içində yaşayacaqsan, dəxi niyə özgə millətləri bəyənmirsən ki, onlar hamamlarının tüstüsü ilə qonşuları boğmurlar?

Hər yan tüstüdür, məclislərdə və evlərdə duxaniyyat və məşrubat tüstüsü, küçələrdə hamam tüstüsü, mənəviyyatda mövhumat tüstüsü, ruhda və qəlbdə kəsafət tüstüsü...

Xülasə, millət tüstü içində boğulmaqdadır! Və boğula-boğula nicata müntəzirdir.

-Kimdən?

-Hər bir vicdan sahibindən, hər bir həqiqi vətən dostundan, hər bir bəni-növibəşərə rəhmi gələndən. Millət boğulur, tüstülər milləti hər tərəfdən əhatə eləyib. Əgər dadü fəryadə tez yetişməsəz, mümkündür ki, millətdən bir əsər dəxi qalmaya.

Tələsmək lazımdır.

*İmza: Hərdəmxəyal*

## MƏKTUB ƏZ SƏRAB

Əz modire möhtərəme cərideye fərideye "Molla Nəsrəddin" xahişməndəm in mətalib ra dərc fərmayəd.

Ey Molla əmi, bizim Sarab şəhərində bir hakim var, altı ayın müddətində neçə dəfə naxoş olub təbibə ehtiyac düşdü. Biçarə həkim bimüzayiqə gedib dəva verib ki, bu hakimdi, pul istəmək danışmaq yaxçı degil, özü verər, axırda biçarə həkim surət yazıb hamısı dörd tümən hakimə yolladı pul əvəzinə hakim ağa mübarək xəttinnən surət altında yazıb ki, (ixtiyar darid).

İndi Molla əmi, biçarə doxtur məəttəl qalıb, bilmir bu kəlməni necə mə'na eləsin. Bazarda heç kəs o kəlməni almır, arvad, uşaq, nökər, külfət pul, çörək, paltar istər. Sənnən xahişim budur Təbrizdə (ixtiyar daridi) bazarda istəyən olsa orada sat, ya da yaz görək...

Bu banknotun zamini hansı bankdır.

*Müzdsiz fə'lə*

## MƏŞRUBAT

Dünən bir nəfərdən eşitdim ki, erməni şərabçıları ramazan ayına biqərar müntəzirdirlər. Səbəbini soruşdum, cavab verdi ki:

-Ramazan gecələri arağın və çaxırın müştərisi çoxalır.

Mən təəccüb elədim və rəfiqim and içdi ki, müsəlmanlar orucluq gecələri qeyri vaxtlardan artıq şərab içirlər.

Bu belə.

Şəriətimiz məşrubatı haram buyurub, amma and olsun Allaha ki, müsəlmanlar qeyri millətlərdən də artıq içib keflənmək dərdinə mübtəladırlar. Belə olan surətdə biz, demək şəriətə də baxmırıq.

Bu da belə.

Məşrubatı Rusiya hökuməti iki dəfə qədəğən elədi: bir dəfə Kerenski zamanında, bir dəfə də kommunistlər qədəğən elədilər. İndi bu saat Rusiyada bir nəfər içib keflənə, ya dükanda, evdə içki saxlaya, səxt mücazata düçar olacaq. Amma islam şəriətinə qail olan Təbrizdə əğləb müsəlmana rast gəlirsən, onu kefli görürsən.

Bu da belə.

Bizdə dəxi utanmaq qabiliyyəti qalmayıb: Adam adama deyər: "Əgər Allahdan utanmırsan, barı bəndədən utan". Əgər şəriətdən utanmırsan, barı xaçpərəstlərdən həya elə! Əgər xaçpərəstlərdən utanmırsan, barı bütpərəstlərdən utan. Yoxsa sən gündüzlər oruc tutub, gecələr pulunu çaxır satanlara xərcləyəcəksən, yoxsa adını müsəlman və insan qoya-qoya əziz vaxtını və bədənini araq və çaxır zəhərləri ilə zay edəcəksən, o və'də sən həm Allah yanında məsulsan, həm əhlü-əyalın yanında xəcilsən, həm insaniyyət aləmində yerin alçaq məqamlarda qərar tutacaq.

Bu da belə.

Qaldı hökumətimiz.

Bilmirəm, səbəb nədir ki, hər ayda və hər gün hökumət tərəfindən gah filan şey qədəğən olunur, gah filan iş mən' olunur, gah filan iqdamata ya filan ticarətə icazə verilmir.

Niyə bəs indiyə kimi bircə dəfə də olmayıb və görsənməyib ki, müsəlman hökuməti tərəfindən islamda haram buyrulan və cəmi millətlər içində qədəğən olunan məşrubat iste'malı kimi ərzəl bir işə rəsmi qədəğənçilik sadir ola.

Məşrubatı qədəğən eləməyə nə bir çətinlik?

Meyxanaları mən etməyə nə bir mane? Kimdir hökumətin əlini tutan ki, qələmi götürə və imzalaya ki, min bə'd küçə və bazarda, evdə və məclislərdə məşrubat içənə və məşrubat satana və məşrubat saxlayana bu qədər cərimə və bu qədər həbs qərar veriləcək.

Bu nə bir çətin məsələdir? Kimdir buna mane' olan və mümkündürmü belə bir müqəddəs qərardadı bu gündən sabaha qoymaq?

Belə mə'lum ki, bizim annımızda yazılmayıb ki, yer üzündə biz də varlığımızı bildirək.

Yəqin ki, yazılmayıb.

*Mozalan*

## ÇİMDİK

Fitilbörk şəhərində bir neçə yoldaş getdux bir kilsəyə tamaşaya. Arvad-kişi qarışıq durmuşdular. Nagah bizə yaxun bir xanım birdən dik daşlandı və başladı "vuy-vuy" eləmağa. Bir kişi yavaşca soruşdu ki: nə var? Xanım dedi ki: məni əqrəb sancdı. Bir də gördüm mənim yoldaşım Mirzə Cəfər gülür. Soruşdum ki: onu əqrəb sancıb sən niyə gülürsən? Mirzə Cəfər baş barmağıynan səbabə barmağını kəlfətin kimi edəndən sora mənə baxdı, genə də güldü. Annadım ki, çimdik. Fitilbörkdən Odessaya kimi qaçdım. Odessada bir gün bulvar xiyabanında gəzirdux, bir neçə nəfər həmşəriyə rast gəldim. Bərabər getdux bir gülçü mğazasından dəstə gül almağa. Bir çoxlu xanımlar düzülmüşdülər dəstə gül istirdilər.

Birdən bir gözəl qız "vuy" eləyib çığırdı. Bir də gördüm ki, bizim Məşədi Nəsir həmşəri gülməkdən uvunub. Dedim: eybdi, xanımların içində bicəhət niyə gülürsən? Bu da Mirzə Cəfər kimin barmaqlarını kəlfətinə oxşadan kimi etdi. Asta qaçan namərddir deyib son nəfəsimi Xorasanda aldım. Bir gün ziyarətə məşğul idim, arvad-kişi qarışıq ziyarət eləyirdilər. Bir də onda gördüm bir xanım əssəlam əleyk deyib bir o yan, bu yana baxır. Genə bir kəlmə ziyarətnamə oxuyub bir yan-yörəsinə göz gəzdirir. Davam edə bilməyib dedim: xanım, məgər bir şey itirmisiz? Bir də gördüm ziyarətnaməxan bir seyyidi-nurani gülür. Soruşdum ki: niyə gülürsən? Elə istədi ki, barmaqlarını kəlfətin qayırsın mən götürüləndim, sorağımı Təbrizdə aldım. Burada da daş mağazalar!

Şəhrinov, Əmir bazarı! Şeşgilanın bə'zi küçələrindən "vuy, vuy" səsindən keçilmir və hər "vuy, vuy" səsi eşitdikcə kəlfətin barmaqlar yadıma düşür. Yəqin elərəm ki, bu "vuy, vuy"lar da o "vuy, vuy"lardandır. Mütəhəyyir qalmışam ki, yol yox, burdan hara qaçım? Bular hamısı keçər, amma sizi inandırıram ki, əgər bizim bir müsəlman xanımı urusların lap qaranlıq bir küçəsindən də keçə, hətta bir kefli urus da onu rahatsız etməz.

*Utanmaz kətdi*

## ƏFRADİ-SALEH

Hər kəsdən soruşuram ki, axır, bizim ədliyyəmiz nə səbəbə münhəll oldu? Mənə cavab verir ki, tazə ədliyyə əfradi-salehdən təşkil tapacaq. Deyirəm bəs belə mə'lum olur ki, təzə əfraddan təşkil tapacaq. Deyir: bəli. Deyirəm: Xub, belə mə'lum olur ki, köhnə əfrad əfradi-saleh cümləsindən deyilmişlər? Deyir: bəli, çox əcəb, indi başlayaq başdan: məsələn götürək təzə vəzarəti-ədliyyə əzasını. Bunlar ki təzə deyil köhnədirlər, azından dörd vəziri-ədliyyə görüblər. Əgər məqsəd köhnələri götürüb, təzələri meydana gətirməkdir, elədə bəs bu nə işdir. Deyir: bilmirəm.

Deyirəm: Xub, gələk Təbrizə: ağayani-flan ki, tazə deyillər, köhnədirlər? Deyir: Bəli. Deyirəm: Xub, Təbriz ədliyyəsini ki, həmin köhnə ağaların vasitəsi ilə təşkil eləmək fikrindədirlər. Deyir: Bəli. Deyirəm: Xub, söz yox ki, ağayani-flan əfradi-salehdəndirlər. Deyir: Bəli, bəli, əlbəttə. Xub.

İndi görək axır təzə nədir, köhnə nədir? Görək köhnələr imiş əfradı-saleh, ya təzələr olacaq əfradi saleh? Əgər köhnələr əfradi-salehdən idilər, dəxi ədliyyənin inhilalına nə bəhanə var idi?

Əgər əfradi-saleh məhz təzələrə deyirlər, bəs ağayi-filan və ağayi-filan ki, çox çox köhnələrdir.

Mən bu sözləri danışanda mənə deyirlər ki, "dəlisən". Danışmayanda ciyərlərim az qalır içərimdə od tutub yansın. Doğrudan bəlkə mən dəliyəm?

Amma öz aramızdı, burada yaxşı fürsət düşmüşdü bir neçə ləğəbləri lüğətdə tapıb mə'na eləyəm. Allah baisin evini yıxsın. Bizim balaca uşaq bir dəfə asqırdı, istədim gözləyəm, ta səbir keçsin. Mətbəədən adam gəldi ki, tez ol durma, məqalələri göndər düzsünlər, yoxsa Xorasandan təzə təqvim gəlib, məşədilər bu saat qurdalayıb bir təzə tə'til çıxardacaqlar, ruznamən bir gün dalı düşəcək.

*Dəli*

Müdir və sərmühərrir: Cəlil Məmmədquluzadə

Vəkillərimiz:
Təbrizdə – Dəme məqbərə, tovziye cərayed.
Bazari şişegərxane, kitabxaneye "Pərvəriş".
Dəme hərəmxane, mətbəeye "Hüseyni".

Təbriz, mətbəeye "Ümid".

*Uşağın ad qoyması*



**Seyid Əli Müsəvvirzadə, Bəhzadi**

***Mətbəeyi-İskəndani***

Bu uşağa nə ad qoyaq? Heydərqulu? – Yox, yox!Heydərqulu xalaqızımın baldızının oğlunun adıdır. Cəfər qoyaq? – Yox, yox! Aman günüdi, dayıqızım inciyər.Cəfər dayıqızımın uşağının adıdır. – Novruzəli. – Yox, yox! Həlmə bibinin acığı gələr, onun uşağının adıdı. – Zülfiqar. – Yox, yox! O da olmaz. Siğə qardaşımın adıdı. – Əsgər. – Yox, yox! Aman günüdü, Nurcahan xala başımı yarar. Onun nəvəsinin adıdır. – İsmayıl qoyaq. – Yox, yox! Zəhra küsər. Əli. – Yox! – Rəcəb. – Yox! – Nəcəf. – Yox! – Həsənəli. – Yox! – Məhəmməd Qasım. – Yox!Kazım. – Yox! Qonşumuzun uşağının adıdır. – Mənə bax görüm, Əbdüləli qoyasıız, necədi?

– Va! Ay kişi, onu istiyirsən ki, Məmmədvəli kirvəmiz ömürlüginən bizinən ədavət bağlasun? Olmaz! (Mabədi var)

– Hələ qalsın sabaha.